WIKIPEDIA

# Elm

Vikipediya, azad ensiklopediya



**Bu məqaləni vikiləşdirmək lazımdır.**
Lütfən, məqaləni ümumvikipediya və redaktə qaydalarına uyğun şəkildə tərtib edin.



**Elm** obyektiv, sistemli və əsaslandırılmış biliklərin əldə edilməsinə, dəqiqləşdirilməsinə və yayılmasına yönəlmiş insan fəaliyyəti növüdür. Bu fəaliyyətin əsasını elmi faktların toplanması, onların daima yenilənməsi və sistemləşdirilməsi, tənqidi analizi və bu əsasda elmi biliklərin toplanması təşkil edir. Elm təkcə müşahidə edilən təbiət və ictimai halları təsvir etmir, həm də onların əlaqələrini tapır və nəticəni müəyyən edə bilir.

**Elm** – 1) təbiət və cəmiyyətin inkişaf qanunauyğunluqlarını və obyektiv aləmə təsiri üsullarını öyrənən (meydana çıxaran) biliklər sistemi və bu biliklərin ayrıca sahəsi. İnsan biliklərinin müəyyən bir sahəsi. Məsələn, elmlə məşğul olmaq, həyatını elmə sərf etmək, oxumaqla əldə edilən bilik, məlumat. Bəzən savad, məlumat mənasında. Elmilik – elmi olma, elmə əsaslanma, elmi mahiyyət daşıma. Məsələn, nəticələrin elmiliyi, sübatların elmili-yi. Elmli – təhsil görmüş, təhsil almış, təhsilli, oxumuş, ziyalı; 2) insanın əməli və nəzəri fəaliyyətinin spesifik sahəsi; ictimai şüur formalarından biri. Elmin cəmiyyətin məhsuldar qüvvələrinin inkişafına və ictimai həyatın müxtəlif sahələrinə təsirinin sosial nəticələri mühümdür. Elm həmçinin təbiət, cəmiyyət və təfəkkürün inkişaf qanunları haqqında biliklər sistemidir.




## Mündəricat



## Ümumi məlumat

Hər hansı bir elm haqqında təsəvvür bu elmin obyektini, predmetini, metod və prinsipini öyrənməkdən başlayır.

*Elm* aşağıdakı şərt və dərketmə komponentlərini özündə birləşdirir:

- elmi əməyin bölünməsi və birliklərinin yaranması;
- elmi müəssisələr, sınaq və laborator avadanlıqları;
- elmi-tədqiqat işlərinin metodları;
- dərketmə və kateqoriya aparatı;
- elmi informasiya sistemi;
- əvvəldən toplanmış bütün biliklər məcmusu.

Elm yarandığı gündən insanların əmək məhsuldarlığının artırılması və bunun sayəsində onun rifahının yaxşılaşdırılmasına xidmət etmişdir. Elmlə məşğul olan şəxslərə "alim" deyilir. Onlar insanların arasından öz bacarığı, savadı və düşüncəsi ilə fərqlənirlər.

## Elm tarixi

Elm müasir halda XVI-XVII əsrlərdən formalaşmağa başlayıb. Tarixi inkişafında o, texnika və texnologiya çərçivəsindən çıxaraq cəmiyyətin inkişafına ciddi təsir edən faktora çevrildi. XVII əsrdən başlayaraq elmi fəaliyyət hər 10-15 ilə iki dəfə artır (kəşflərin sayı, elmi informasiyalar, elmi işçilərin sayı).[1]

## Alimlər

Alimlərin məqsədi mövcud iş şəraitində birbaşa və ya dolayı yolla insanların həyat tərzinin yaxşılaşdırılmasından ibarətdir. Ona görə də, tarix boyu alimlərin işləri dövlətlərdə söz sahibi olan şəxslər və qurumlar tərəfindən dəstəklənmiş və nəzarət edilmişdir. İlk təşkil olunmuş şəkildə aparılan elmi işlərə Qədim Yunanıstanda, Platon akademiyasında rast gəlinir. Əvvəllər elmlə məşğul olan şəxslər saray əyanları kimi

xüsusi imtiyazlara malik olsalar da, sonradan onlara verilən elmi dərəcələrlə cəmiyyətdə elitar bir təbəqə yaranmışdır.

## Beynəlxalq elmi mükafatlar

Elmi nailiyyətlərə görə alimlərə aşağıdakı nüfuzlu beynəlxalq mükafatlar verilir:

- Nobel mükafatı — dünyada ən nüfuzlu elmi mükafat. İldə bir dəfə dörd elm sahəsi üzrə verilir.
- Fildsov mükafatı — riyaziyyat sahəsində böyük nailiyyələrə görə, İspaniya kralı tərəfindən təqdim edilir.
- Rolf Nevanlinni mükafatı — informatikanın riyazı aspektlərində böyük uğurlara görə.
- Karl Fridrix Qauss mükafatı — digər elmlərdə kəşflər vasitəsi ilə riyaziyyata böyük töhfələrə görə.
- Kraufurd mükafatı — mükafat astronomiya, riyaziyyat, bioloji elmlər və Yer haqqında elmlər üzrə verilir.
- Abel mükafatı — riyaziyyatın inkişafına töhfəyə görə.
- Şao İfu mükafatı — astronomiya, riyaziyyat, tibb və həyat haqqında elmlərə verilən böyük töhfələrə görə.
- Türinq mükafatı — hesablama texnikası assosiasiyası tərəfindən informatika sahəsində verilən mükafat.
- Mixail Lomonosov adına böyük qızıl medal — Rusiya Elmlər Akademiyasının ali mükafatı.
- Dmitri Mendeleyev adına böyük qızıl medal — Rusiya Elmlər Akademiyasının kimya elmi sahəsində böyuk nailiyyətlərə görə mükafatı.

## Həmçinin bax

- Alim
- Aspirantura
- AMEA

## İstinadlar


1. "Наука" (http://slovari.yandex.ru/dict/bse/article/00051/57700.htm)


| | |
|---|---|
| **Lüğətlər və ensiklopediyalar** | Böyük rus (http://bigenc.ru/text/2251677) • Brokhauz və Yefron • Brokqauz və Yefron kiçik • V.Dal • Britannica (onlayn) (http://global.britannica.com/topic/science) |
| **Normativ yoxlama** | BNE: XX526275 (http://catalogo.bne.es/uhtbin/authoritybrowse.cgi?action=display&authority_id=XX526275) • BNF: 11933232c (http://catalogue.bnf.fr/ark:/12148/cb11933232c) • GND: 4066562-8 (http://d-nb.info/gnd/4066562-8) • LCCN: sh00007934 (http://id.loc.gov/authorities/sh00007934) • NDL: 00571322 (http://id.ndl.go.jp/auth/ndlna/00571322) |

**Elmlər**

Elmi istiqamətlər • Elm haqqında

Humanitar • İctimai • Təbiət • Texniki • Tətbiqi

Riyaziyyat • Fizika • Kimya • Coğrafiya • Astronomiya • Geologiya • Biologiya • Tarix • Dilçilik • Filologiya • Fəlsəfə • Psixologiya • Sosiologiya • Antropologiya • İqtisadiyyat • İnformatika